# DİNİMİZƏ GÖRƏ "YENİ İL KEÇİRMƏK" OLARMI?

# *ƏTRAFLI ŞƏRH*

Rəhman və Rəhim olan Allahın adı ilə..Həmd və tərif Ona məxsusdur..Allahın Salam və Salatı Sevgili Peyğəmbəri - Muhəmmədin, Onun Ailəsinin (Əhli-Beytinin), Səhabələrinin və Qiyamətə qədər bu yolla gedənlərin üzərinə olsun Bundan sonra.

Bizi **MÜSƏLMAN OLARAQ** yaradan **Uca Allaha** sonsuz həmdu-sənalar olsun.Çünki, müsəlman - olmaq şərəfdir, izzətdir, insanı insan edən ən böyük amildir.Bu nemət üçün **Uca Allaha (Azzə va Cəl)** nə qədər şükr etsək, azdır. Neçə-neçə insan bu nemətə layiq olmadıqları halda, **Uca Allah** bizləri sevdi, seçdi, izzətə layiq gördü.İslamı özünə həyat prinsipi edən insan necədə xoşbəxt insandır.Bunu yalnız düşünənlər bilər.

Müsəlman olub, **MÜSƏLMAN KİMİ YAŞAMAQ** -bəzilərinin zənn etdiyi kimi- qaranlıq bir dünya yox, işıqlığa/aydınlığa aparan və sonu Cənnət olan bir yoldur.Müsəlman - hər an, istənilən vəziyyətdə **Uca Allahın və Onun Rəsulunun (sallallahu aleyhi va Əlihi va səlləm)** əmrlərinə uymalı, yasaqlarından çəkinməli, nəfsini bu əmr və yasaqlardan üstün tutaraq özünü aldatmamalıdır.Əsl İslam və müsəlmanlıq da, məhz budur.

**Bu mühüm notları vurğulayaraq, günümüzdə ən məşhur məsələlərdən birinə toxunmaq istəyirik.**

## YENİ İL.
## Miladi təqvim ilə, yeni ilin daxil olması və bu münasibətlə bayram keçirilməsi.

Həqiqət budur ki, dünyanın böyük bir qismi bu bayramı böyük təm-təraqla qeyd edir.Bu qismə həmçinin ölkəmizi də, qatmaq olar.Bu halda **BÖYÜK BİR SUAL** yaranır:

**- BELƏ BİR BAYRAMIN KEÇİRİLMƏSİNƏ HƏYAT QANUNUMUZUN/DİNİMİZİN MÜNASİBƏTİ NECƏDİR?.BU BAYRAMI KEÇİRMƏK, QEYD ETMƏK və s. OLARMI?.**

Təbii ki, **MÜSƏLMAN** bir kimsə hər bir etdiyi əməl öncəsi bunları düşünməlidir...Çünki, bəzən çox bəsit/əhəmiyyətsiz yanaşdığımız məsələlər **DİNİMİZİ POZA** və **İMANIMIZI BÖYÜK TƏHLÜKƏ QARŞISINDA QOYA BİLƏR**. (Allaha sığınırıq..)

Bunun üçün bu məsələni səbrlə, ətraflı şəkildə tətqiq etməyə böyük bir ehtiyyacın olduğunu düşünürük.

**Uca Allah (Subhənəhu va Təalə) Öz mübarək kitabında buyurur:**

**"Ey iman gətirənlər! Yəhudi və xaçpərəstləri dost tutmayın! Onlar bir-birinin dostudurlar. Sizlərdən kim onları (özünə) dost tutarsa, o da onlardandır. Allah zalım adamları doğru yola yönəltməz..."(əl-Maidə 51)**

İbn Kəsir və başqa təfsir alimləri bu ayədə "dost" deyərkən: Kafirlərin bütün söz və davranışlarını - adətlərini, bayramlarını və b. kimi əlamətlərini götürüb , qəbul edib , tətbiq etmək - olduğunu demişlər...
Bu haqda Qurani-Kərimdən çoxlu ayələr zikr etmək olar...Biz sadəcə birinə, ən əsasına toxunduq..(Ümumiyyətlə isə, bu haqda digər ayələr də, olduqca çoxdur..Bax: Casiyə 18; əl-Bəqərə 145; Furqan 72 və s.)

**Allahın Rəsulu (sallallahu aleyhi va səlləm) buyurur:**

**"...And olsun ki, sizdən öncəkilərin yoluna qarış-qarış uyacaqsınız.Hətta onlar hansı deşiyə soxulsalar, siz də, ora soxulacaqsınız.Səhabələr dedi: - Ey Allahın Rəsulu, Yahudi və Xristianları qəsd edirsiniz? Rəsul: "BAŞQA KİM OLACAQ Kİ?!" -deyə cavab verdi."(Buxari və Muslim)**

**Başqa bir hədisdə Allahın Rəsulu (sallallahu aleyhi va Əlihi va səlləm) buyurur:**

**"...Kim bir qövmə/tayfaya bənzəyərərsə, o da, onlardandır..."(Əbu Davud - səhihdir)**

**Peyğəmbərimiz (sallallahu aleyhi va səlləm) Mədinəyə gələrkən bir qrup insanın oynayıb-əyləndiklərini 2 günün olduğunu eşidir..." - Bu günlər nədir?" -deyə soruşduqda, onlar: "-Cahiliyyət dövründə bu 2 gündə oynayardıq.." - dedilər..Peyğəmbərimiz isə, buyurdu: "...ALLAH SİZƏ BUNLARDAN DAHA XEYİRLİ OLANLARINI VERDİ: QURBAN VƏ RAMAZAN BAYRAMLARI.."(Əbu Davud - səhihdir)**

**Bu məqamda Həzrəti Ömərin (radıyallahu anhu) sözünü qeyd etməkdə böyük fayda var".ALLAHIN DÜŞMƏNLƏRİNİN BAYRAMLARINDAN ÇƏKİNİN!."(Beyhəqi, "əs-Sunən`ul-Kubra")**

Görüdüyümüz kimi, bu "bayram" haqda Quran və Sunnətdən. Şəriətdən nasslar, dəlillər sabitdir.Müsəlman şəxs yalnız itaət edərək, Allahdan qorxu və sevgisini büruzə verməlidir.

**Uca Allah beləleri haqda buyurur:**

**"Bunlar Allahın hüdudlarıdır. Kim Allaha və Onun Elçisinə itaət edərsə, (Allah) onu (ağacları) altından çaylar axan, içində əbədi qalacaqları Cənnət bağlarına daxil edər. Bu, böyük uğurdur..."(Ali İmran 13)**

Dövr dəyişdikcə, bü cür məsələlər şaxələnərək əvvəllər olmayan digər məsələlərə yol açır.Buna görə də, biz yazılanlarla kifayətlənməyib , Allah və Rəsulunun tər-təmiz yolu ilə gedən Alimlərin bu məsələlər haqda sözlərini zikr edəcəyik.

**Məsələni daha yaxşı anlamaq üçün ilk öncə, Bayram sözünün, termininin əsl mənasını nə olduğunu bilmək lazımdır.**

**Şeyxul-İslam İbn Teymiyyə** (rahiməhullah) bayram termini haqda buyurur:
"...Buradakı açıqlamalardan anlaşıldığına görə "Bayram" termini "müəyyən bir zaman içində, dönüşlü bir şəkildə təkrarlanan, "hər kəsin üzünə açıq bir toplantı" mənasına gəlir.Bu dönüşlü təkrarlama ildən ilə ola biləcəyi kimi, həftədən həftəyə və ya aydan aya ola bilər...Bayram termini bu təməl mənadan başqa bir neçə mənada da anlaşıla bilər.Bu mənalardan biri "dönüşümlü şəkildə təkrarlanan gün" deməkdir...Ramazan bayramı və Cümə günü kimi. Bayramın bir digər mənası da müəyyən günlərdəki toplantıdır.Bu terminin başqa bir mənası da, bayram günlərində edilən ibadət və adətlərin cəmidir."(**"İqtida`us Siratal Mustəqim li Muxalifətu Ashabul Cəhim " 1-ci cild, 483-cü səh.**)

**Şeyxul-İslamın** bu bayramlara qatılmaq haqqındakı sözlərinə diqqət yetirək:
"Başqa bir tərəfdən kafirlərin bayramları mövzusunda bənzəməyin haramlığına dəlillər çoxdur.Məsələn: bunlardan biri Peyğəmbərimizin "kim bir qövmə bənzəməyə çalışarsa o da onlardandır" şəkilindəki əmri kimi. Bu hədis kafirlərə bənzəməyin mütləq mənada haram olmasını tələb edir.Başqa bir dəlil də, Peyğəmbərimizin "Müşriklərə müxalifət edin" şəklindəki əmridir.Bu cür dəlillər sayca çoxdur...Daha öncə bildirdiyimiz kimi, istər Quranda, istər Sunnətdə "qəzəbə düçar olmuşların" və "azmışların" yolları ilə getməyin haram olduğunu göstərən çox sayda dəlillər var.Heç şübhəsiz, kafirlərin bayramları onların "yollarının" bir hissəsidir.Müşriklərin bayram toplantıları həm görünüşdəki aldadıcı bənzərlik, həm şəhvət duyğusunu oxşama, həm də, batil xüsusiyyətlərini birlikdə özündə cəmləmişlər...Buna görə, istər bu toplantıların özü, istərsə də, onlara qatılmaq və ya tamaşaçı olmaq bu terminlə ifadə edilmişdir.Allah (Azzə va Cəl) bu mərasimlərə tamaşaçı olmayanları tərifləyir:

**"O kəslər ki, yalandan şahidlik etməz, lağ-lağı məclisinə rast gəldikdə (oradan) ləyaqətlə ötüb keçərlər."(Furqan 72)**

(Şeyx davam edir:) Tamaşaçı olmaq, ancaq görərək və ya iştirak edərək hadisə yerində olmağı ifadə edir.Daha da irəli gedərək tamaşaçı olmaqla kifayətlənməyib, bu cür mərasimlərə qatılmanın hökmü necə olar?Bunu da siz düşünün. Peyğəmbərimiz Mədinəyə gəldiyi zaman yerli xalqın əylənərək qeyd etdiyi iki bayram gününün olduğunu gördü.Mədinəlilərə: "bu bayram gününü mənası nədir?" - deyə sual verincə onlardan "Biz cahiliyyə dövründə bu günlərdə əylənirdik" cavabını aldı.Mədinəlilərə belə buyurdu: "..Allah sizin iki əyləncə gününüzü, onlardan xeyirli olan bu iki günlə dəyişdirdi.Bu iki gün Qurban və Ramazan bayramı günləridir."(son hədis üçün bax: Əbu Davud: "Sunən": 1-ci cild, səh.675. 1134-ci hədis hədis.)(**"İqtida`us Siratal Mustəqim li Muxalifətu Ashabul Cəhim"**)

Bu cür şənliklərə içki, qadın-kişi qarışıqlığı, zina və zinaya aparan yolları da, qatmış olsaq, məsələnin şiddəti daha da, artar.. Sadalanan asiliklərə toxunmağa isə, ehtiyyac olmadığını düşünürük.

Kafirlərə bənzəməyin olduqca təhlükəli olması ilə bağlı Abdullah bin Amr bin əl As (radıyallahu anhumə) belə buyurur: "Kim kafirlərin ölkəsində bina tikərsə, onların novruzlarına və şənliklərinə qatılarsa və ölənə qədər onlara bənzəyərsə, qiyamət günü də onlarla bərabər beləcə həşr olunar(dirildilər)"(Beyhəqi, "əs Sunənul-Kubra" 7-ci cild, səh.105)

**Şeyxul-İslam Əhməd İbni Teymiyyə** (rahiməhullah) məsələni daha da, açaraq buyurur:
"Müsəlmanların onların bayramlarına aid olan şeylərdən hər hansı birində onlara nə yemək, nə geyim, nə od qalama, nə gündəlik bir adəti və ya ibadəti zay etmə yönündən bənzəmələri **HALAL DEYİLDİR!**Bu məqsədlə ziyafət vermək, hədiyələşmək və bunları təmin edəcək alış-veriş, uşaqlar və bənzərlərinin bayram əyləncələri qurmalarına imkan vermək HALAL DEYİLDİR.Qısa olaraq, onların bayramlarına, onların etdikləri hər hansı bir simvolla qatılmaq müsəlmanlara halal deyildir.Əksinə, kafirlərin bayram günləri müsəlmanların nəzərində eynilə digər günlər kimidir."(**"Məcmu əl-Fətava" 25-ci cild, səh.329**)

Bayram mövzusunda nəinki qeyd etmək hətta qeyd edənə yardım etmək belə haramdır!

**Şeyxul-İslam İbni Teymiyyə** bu haqda buyurur:
"Bayramlarda onlara bənzəməyə çalışmayacağımız kimi, bu mövzuda onlara bənzəməyə çalışan bir müsəlmana da, yardım EDİLMƏZ!..Əksinə, bunu etməkdə ona mane olunur!Kim -adətə müxalif olanlardan başqa- kafirlərin bayramında bir məclis (qonaqlıq) təşkil etsə, onun dəvətinə CAVAB VERİLMƏZ.Müsəlmanlardan kim bu bayramlarda digər vaxtlardakı adətlərdə olmayan bir hədiyyə verərsə, xüsusilə də bu hədiyyə onlara bənzəməyə yardım edəcək cinsdəndirsə, bu hədiyyə qəbul edilməz!Məsələn: ad günündə şam və bənzəri şeylər hədiyyə etmək və ya orucların sonundakı cümə axşamı günü yumurta, süd və qoyun hədiyyə etmək kimi.Eyni şəkildə bu bayramlarda, müsəlmanlardan birinə də, bu bayram münasibətilə, xüsusilə də, onlara bənzəməyə kömək edəcək bir hədiyyə verilməz.Bir müsəlman, müsəlmanların onlara bənzəmələrinə kömək edəcək yemək və geyim SATA BİLMƏZ!Çünki, bunda bir pis əmələ yardım var."(**"İqtida`us Siratal Mustəqim" 2-ci cild, səh.12**)

**Kafirlərin bayramlarına qatılmaq (!) və bayramlarını keçirmək (!) haqda alimlərin daha sərt fətvaları var.Hətta, bu əmələ küfr belə deyən alimlər var.**

**Hənəfi Alimlərindən Aliyyul-Qari** (rahiməhullah) belə dedi:
"Novruz günü (həmç. digər cahiliyyət bayramlarına da, aiddir) məcusilərə (atəşpərəstlərə) YUMURTA hədiyyə etmək küfrdür.Çünki, bununla onların küfrünə və azmasına yardım etmiş və ya onlara novruz günü hədiyyə vermədə bənzəmiş olar.Bütün bunlardan - novruz günü bir Müsəlmana bir şey hədiyyə edərsə təkfir edilməyəcəyi mənası çıxa bilər. Lakin, yenə də, diqqətli olmaq lazımdır.Çünki, burada da bir bənzəmə vardır.Ancaq, novruz hədiyyəsi etmək qəsdi olmadan verərsə ittifaqla bu caizdir."(**ətraflı bax: "Məcməun-Nəvazil"**)

**Şeyxul-İslam İbni Teymiyyə** buyurur:
"Bayramlar dinləri və şəriətləri bir-birindən ayıran ən xüsusi günlərdir, dinlərin ən səciyyəvi simvollarıdır.Bayramlarda onlara (qeyri-müsəlmanlara) uymaq küfrün simvollarının ən səciyyəvisində onlara uymaq deməkdir.Bu məsələdə onlara tabe olmaq şərtləriylə birlikdə, nəticədə tamamən küfrə girməklə nəticələnə bilər (Allaha sığınırıq)."(**"İqtida`us Siratal-Mustəqim" 1-ci cild, səh.528**)

**Alimlər həmçinin, Yeni il və digər günlərdə bayramlaşmaq ("bayramın mübarək olsun" və s.) mövzusuna da, toxunublar.**

Bu haqda **İbnul Qeyyim** (rahiməhullah) buyurur:
"Kafirləri onların öz simvolları münasibətilə təbrik etmək ittifaqla HARAMDIR.Bu - məsələn, onların bayramını təbrik etmək və: "..Bayramın mübarək olsun" və ya: "Bu bayram mübarək olsun" deməkdir.Bunu deyən adam küfrdən qurtulsa belə, haram qılınmış şeylərdən birini etmiş olar.Bu bir xristianı xaça səcdə etdiyi üçün təbrik etmək kimi bir şeydir.Hətta, bu Allah qatında, bir kimsəni **şərab içməsi, adam öldürməsi, zina etməs**i kimi böyük günahlara görə təbrik etməkdən DAHA PİS BİR DAVRANIŞDIR!Dinə dəyər verməyən və bu davranışın pis olduğunu bilməyən bir çox adam bunun içinə düşər.Bir kimsəni üsyanına, bidətinə və ya küfrünə görə təbrik edən adam, mütləq Allahın qəzəbinə məruz qalar."("Əhkəmu əhliz-Zimmə" 1-ci cild, səh.205)

**İnşəallah çalışmamızın faydalı olacağını ümid edərək, mükafatını Uca və Nöqsansız olan Allahu-Təalədən diləyirik.**
**Uca Allah faydalanıb/öyrənib, öyrədənlərdən razı olsun.**
**Uca Allah millətimizə hidayət verərək, bu cür pisliklərdən, haramlardan çəkindirsin.**
**Müvəffəqiyyət Allahdandır...**
**Allahu-Təalənin Salam və Salatı Onun Peyğəmbəri Muhəmmədin, Onun Ailəsinin (Əhli-Beytinin), Səhabələrinin və Qiyamətə qədər bu yolla gedənlərin üzərinə olsun…**
**Hər şeyin daha doğrusunu Allah bilir...**

---

**Hazırladı:Ayxan Yaquboğlu**